# QUBA ƏYALƏTİNİN KAMERAL TƏSVİRİ




BAKI – 2008

AZƏRBAYCAN TARİX QURUMU



# QUBA ƏYALƏTİNİN KAMERAL TƏSVİRİ

(1831-ci ildə kollec reqistratoru Xotyanovski tərəfindən tərtib edilmişdir)



Tərcumə, giriş, qeydlər və yekun cədvəllərin müəllifi
professor TOFİQ MUSTAFAZADƏ



BAKI "SABAH" 2008

*AMEA A. A. Bakıxanov adına*
*Tarix İnstitutu Elmi Şurasının qərarı ilə çap olunur*

**Tərcümə, giriş, qeydlər və yekun cədvəllər**
t. e. d. , professor **T. T. Mustafazadə**

Rəyçilər: t. e. d. , professor V. Z. Piriyev
t. e. d. , professor Ş. F. Fərzəliyev

**Quba əyalətinin kameral təsviri** (1831-ci ildə kollec reqistratoru Xotyanovski tərəfindən tərtib edilmişdir).

Bakı, "Sabah" 2008, səh.752

**İSBN 5-86106-007-X**

M $\frac{0503020907}{029\text{-}2008}$ Qrifli nəşr

# G İ R İ Ş

Mübaliğəsiz demək olar ki, yazılı mənbələr olmadan tarixi öyrənmək mümkün deyildir. Əhali siyahıyaalmalarını əks etdirən sənədlər isə yazılı mənbələrin içərisində özünə məxsus, əvəzolunmaz yer tutur. Bu cür qaynaqların sayəsində biz müəyyən vaxt kəsimi ərzində ölkənin demoqrafik durumu, əhalinin təsərrüfat məşğuliyyəti və sosial, etnik-dini tərkibi haqqında dəqiq məlumat əldə edə bilirik. Ona da görə belə mənbələrin aşkar edilib nəşr olunması tədqiqatçılara çox fayda verə bilər. Təəssüf ki, sovet dövründə siyahıyaalma sənədlərinin nəşrinə demək olar ki, əhəmiyyət verilməmişdir. Son illərdə mərhum akademik Z. Bünyadov və t. e. n. H. Məmmədov (Qaramanlı) bu buzu qıraraq XVIII əsrin birinci yarısında Azərbaycan ərazisinin çox hissəsinin Osmanlı imperiyasına qatıldığı dövrdə Azərbaycanın bir sıra bölgələri üzrə tərtib edilmiş müfəssəl dəftərlərin tənqidi mətnini hazırlayıb Azərbaycan dilinə tərcümə edərək nəşr etdirmişlər. Lap bu yaxınlarda digər iki müəllif (Ş. Mustafayev və Arıqlı) də belə dəftərləri, Z. Hacıyeva isə Qarabağ əyalətinin kameral təsvirini nəşr etdirmişlər. Biz bu müsbət ənənəni davam etdirərək Quba əyalətinin kameral təsvirini ruscadan tərcümə edib nəşr etdiririk.

Yeri gəlmişkən kitabın çapa hazırlanmasında göstərdiyi yardıma görə Tarix İnstitutunun Azərbaycanın qonşu xalqlarla əlaqələri və xanlıqlar dövrü tarixi şöbəsinin əməkdaşları G. Nəcəfli, E. Qarayev, İ. Məmmədova, S. Məmmədli, A. Əmənova, İ. Əliyev, N. Bayramova, E. Əliyeva, G. Şirəliyeva, N. Gözəlova, R. Sultanovaya öz təşəkkürümü bildirirəm.

Azərbaycan Respublikasının şimal-şərq hissəsi – indiki Quba, Qusar, Xaçmaz, Dəvəçi, Siyəzən və qismən Xızı rayonunu əhatə edən ərazi doğma Azərbaycanımızın ən zəngin tarixə malik bölgələrindən biridir. Hələ Albaniya dövründə bu ərazi Çola vilayətinin tərkib hissəsini təşkil etmişdir. Sonralar isə Şirvanşahlar dövlətinin çox mühüm tər-

kib hissəsi olmuşdur. Bu bölgədə yerləşən Şabran şəhəri Azərbaycanın çox mühüm sənətkarlıq- ticarət mərkəzi rolunu oynamışdır.

XVII əsrin sonlarına yaxın isə burada Səfəvi şahlarının təsdiq etdikləri irsi xanlar tərəfindən idarə olunan yarımmüstəqil Quba xanlığı yaranmışdır. 1747-ci ildə Nadir şah Əfşar saray sui-qəsdi nəticəsində həlak olduqdan sonra bu xanlıq tamamilə müstəqilləşir. Tədricən Quba xanlığı qonşu əraziləri ələ keçirir. Hələ 1757-ci ildə Hüseynəli xan öz oğlu Fətəli bəyi Səlyana göndərir və Səlyan yenidən Quba xanlığına qatılır. 1759-cu ildə isə Fətəli xan (1758-1789) Dərbəndi ələ keçirdi. Bu hadisədən sonra uzun müddət Dərbənd şəhəri Quba xanlarının əsl iqamətgahı olmuşdur.

XIX əsrin əvvələrində rus carizmi Şimali Azərbaycanın digər xanlıqları kimi Quba xanlığının ərazisini də ələ keçirtdi. 1809-cu ildə xanlıq ləğv edilib Quba əyalətinə çevrildi. Bu zaman xanlığın Dərbənd və Ulus mahalları əyalətin tərkibinə daxil edilməmişdi. F. A. Şnitnokov 1832-ci ildə yazırdı ki, Quba əyaləti şimalda Samur çayı üzrə Kürə xanlığı (Qazıqumıq), cənubda Qafqaz silsiləsi və Qurdbulaq çayı üzrə Şirvan əyaləti ilə, cənubda Yamqayı (Sumqayıt) çayı üzrə Bakı əyaləti ilə, şərqdə Xəzər dənizi, qərbdə Qafqaz dağ silsiləsi ilə əhatə olunur. Əyalətin hüdudları şimalından cənubuna, yəni Samur çayından Xıdırzində qalasına (Beşbarmaq dağı) 172, 5 verst, şərqdən qərbə 100-120 verst idi. Rus müstəmləkəçiləri işğal etdikləri əraziləri daha yaxşı mənimsəmək üçün həmin yerlərdə evbəev siyahıyaalma keçirirdilər. O cümlədən 1831-ci ildə kollec reqistratoru A. Xotyanovski tərəfindən Quba əyalətinin kameral təsviri tərtib edilmişdir və hal-hazırda həmin təsvir Azərbaycan Respublikası Dövlət Tarix Arxivində saxlanılır (Kazennaə Qruzinskaə Gkspediüiə, f. 24, d. d. 343-345).

Bir qədər Quba əyalətinə daxil olan ərazinin təbii iqlim şəraiti və əhalinin məşğuliyyəti haqqında məlumat verək: Şabranda bütün dəniz sahili 1-3 verstində qumla örtülüdür, sonra şoranlıq gəlir, daha sonra bulaqlar və bataqlıqlar rast



gəlinir. Şabrandan çoxlu dayaz yataqlı çaylar axdığından sel zamanı, ya da çayların yatağını dəyişməsi nəticəsində ətrafa çoxlu daşlar səpələnmişdi. Qumluqlar tamamilə yararsız sahələr olmayıb, üzüm yetişdirmək üçün əlverişli idi[1].

Bölgədən Tıxçay, Ataçay, Gilgilçay, Dəvəçiçay, Şabrançay, Vəlvələçay, Çaqacuqçay, Qaraçay, Ağçay kimi çaylar axır. Onların bir hissəsi Qafqaz dağlarının baş silsiləsindən, digərləri isə dağ ətəklərindən başlayırdılar. Hamısı Xəzər dənizinə tökülür. Şabranda bitki örtüyünə malik yerlərin çoxusunda nə əkin sahələri, nə bağlar var idi. Şabranda təbii çəmənliklər yox idi. Vəlvələçayla Qudyalçay arasındakı ərazidə palıd pöhrəlikləri, böyürtkən kolluqları, qaratikanlıqlar və yemşan kolluqları vardı[2].

Təxminən 2000 kv verstə yaxın məsafəni tutan dağətəyi zona meşəliklərlə və bağlarla örtülmüşdü. Meşələrdə fıstıq, vələs, palıd, qaraağac, ağcaqayın və başqa ağaclar üstünlük təşkil edirdi. Meşələrdə cır alma, armud, gavalı, ərik də çox idi. Kolluqlar içərisində böyürtkən, qaratikan, itburnu kolluqları üstünlük təşkil edirdi. Dağlıq zonanın meşə örtüyü yoxdur, biçənəkləri və yaylaq otlaqları boldur. Dağətəyi zona 2100 kv verstdən çox ərazini tuturdu.

İqlimə gəldikdə isə rütubətli və kəskindir. Şabranda güclü şimal və cənub küləkləri əsir. Yağıntının illik miqdarı kifayət qədər var. Ən çox yağıntılar payız aylarına düşür.

Dağlıq zonadakı kəndlərin bir çoxunun və dağətəyi zonadakı kəndlərin bir qisminin düzənlikdə əkin yerləri və qışlaqları vardı[3].

Qudyalçay əyalətin ərazisini iki demək olar ki, bərabər sahəyə ayırırdı. Bazardüzü dağından Xəzər dənizinə kimi 120 verstdən yuxarı məsafə vardı. Burada Şahdağ, Qaradağ, Xınalıq, Tfanı kimi dağlar var. Şahdağdan Tahircalçay, Düztahirçay, Qusarçay, Qaradağdan Alpan çayı axır. Əyalətin şimal hissəsi də relyefinə, iqliminə, kənd təsərrüfatı şəraitinə görə bir-birindən kəskin surətdə fərqlənən üç zonaya bölünürdü. Birinci dağlıq zona qarlı dağ zirvələri, kəskin dağ yamacları və dərin yarğanlı çay yataqları ilə zəngindir. Bu

zonada meşələr və kolluqlar qətiyyən yoxdur, əkin sahələri çox azdır. Yaylaq otluqları çoxdur. Bu zonada Tahircal çayı boyunca Sudur və Kuxur, Qusarçay boyunca Ləzə, Küzün və Kiçik Mürül, Qudyalçay boyunca Krul, Çek və Ələk kəndləri, Qudyalçayın qolu Böyükçay boyunca Qala Xudat və Xınalıq yerləşirdi. Bu zonada cəmi 4 ay yarım isti olduqdan sakinləri yalnız darı və arpa yetişdirə bilirdilər. Kəndlilər başlıca olaraq maldarlıqla məşğul olurdular[4].

İkinci dağətəyi zonada meşələr çoxdur. Bu zonada dağ yamacları kəskin zirvələri olmayan yüksəkliklər forması alır. Bu yüksəkliklər şimal-şərqə doğru azalır. Palıd, fıstıq, vələs, qoz, yabanı alma və s. ağaclar çoxdur. Geniş buğda, arpa, pərinc tarlaları, habelə kolluqlar çoxdur. Düztahirçay və Qusarçay arasında arasındakı vadidə Urva, Gil, Piral, Ukuz və Düztahir kəndləri, habelə Qusarçay və Qubaçay arasında Susay, Küsnətbala və başqa kəndlər yerləşirdi. Bu zonada yayda yağıntı çox olduğundan süni suvarmaya ehtiyac yoxdur. İstilər ilin 6,5 ayı davam edir. Bu zonada nə üzücü istilər, nə də kəskin şaxtalar olmur. Burada geniş miqyasda yerlilərin «xırda-buğda» adlandırdıqları buğda növü, arpa, pərinc əkilir, eyni zamanda bağçılıq inkişaf etmişdi. Bağlarda alma, albalı, gilas, armud və qoz yetişdirilirdi[5].

Düzənlik zona Müşkür adı ilə tanınır. Qudyalçay, Yalama və Samur çayları arasındakı ərazini tutur. Bu zonada qış üç aydan çox davam etmir, qar demək olar ki, düşmür. Yayda üzücü istilər olur. Kəndlilərin çoxu yayı yaylaqda keçirir. Müşkürdə də sıx meşələr vardır. Bu zona başlıca olaraq qışlaq rolunu oynayırdı. Qışlaqlarda mal-qara üçün qış pəyələri, çobanlar üçün qazmalar olan yataqlar vardı. Müşkürün torpağı çox münbit və məhsuldardır. Qaratorpaq və gillidir. Burada «sarı buğda» adlandırılan buğda növü, çəltik, pambıq, üzüm və s. yetişdirilirdi.

Kotana adətən 4 cüt kəl qoşulurdu. Lakin kəndlilərin çoxunun bu qədər kəli yox idi. Buna görə bir neçə təsərrüfat birləşib torpağı şumlayırdı. Səpin də birgə həyata keçirilirdi. Biçin üçün kənardan adamlar cəlb edilirdi. Onlara zəhmət



haqqı kimi taxıl verilirdi. Qalan məhsul qoşulmuş kəllərin sayına uyğun bölünürdü. Kotandan istifadə üçün 3 ruba (27 pud) taxıl ödənilirdi[6]. Bir gün ərzində 1 rubaya qədər (3/4 desyatin) toxum səpilirdi.

İkitarlalı və dincə qoyma əkin üsulundan istifadə olunurdu. 3-4 il taxıl əkiləndən sonra həmin sahə 2-3 il herikə qoyulurdu. Az məhsuldar sahələrdə adətən cəmi bir il taxıl əkilir, sonra herikə qoyulurdu. Məhsuldar sahələrə adətən 2 il buğda və (yaxud bir il buğda və bir il pərinc), üçüncü il arpa səpirdilər. Sonra 3 və hətta bəzən 4 il dincə qoyur və ondan biçənək kimi istifadə edirdilər[7].

Payızlıq buğda adətən oktyabrda, noyabrın birinci yarısında səpilirdi. Yazlıq pərinc və çəltiyi isə mayın sonunda səpirdilər.

Əyalətin şimal hissəsində adətən kəndlilər böyük ailə halında yaşayırdılar. 3, 4 bəzən 5 qardaş bir evdə yaşayır və birgə təsərrüfatla məşğul olurdular. Ata olmadıqda böyük qardaş ailə başçısı rolunu oynayırdı. Buna görə də torpaq bölgüsü gec-gec həyata keçirilirdi[8].

Rus qoşunlarının 1796-cı ildə Azərbaycana yürüşü zamanı Qafqaz qrenader alayının zabiti (sekund-mayoru) Fyodr Simonoviç tərəfindən Qara dəniz qrenader taborunun mayoru Averyan Serebrovun köməkliyi ilə Quba xanlığının təsviri tərtib olunmuşdur. Həmin təsvirdə deyildiyinə görə 1796-cı ildə, eləcə də mövcudluğunun əksər dövrlərində Quba xanlığının əhatə etdiyi ərazi 8 mahala bölünürdü: Quba, Rustov, Müşkür, Şabran, Sədan, Bərmək, Xınalıq, Buduq[9]. Rus qoşunlarının 1796-cı ildə Azərbaycana hərbi səfəri zamanı tərtib olunmuş jurnalda qeyd olunurdu ki, Samur, Qusar və Qudyal çayları boyunca kəndlərdə yaşayan qubalılar bu torpağın köklü sakinləri olub türk adlanan dildə danışır və sünni məzhəb müsəlmanlardır. Əyalət əhalisi içərisində ikinci yeri azərbaycanlılaşaraq iki dildə – türk və tat (korlanmış fars dilində danışan tatlar), sonrakı yeri Qafqazdilli xalqlar tuturdular. Tatlar əsasən Müşkür, Şeşpara (Rustov), Sədan və Bərmək mahallarında yaşayırdılar[10]. Akademik Z. Bünya-

dovun yazdığına görə tatlar hələ IV əsrdə Sasani hökmranlığı dövründə Cənubi-Qərbi İrandan Şirvana köçürülüb və burada alban qəbilələrinin yerini tutmuşlar[11]. A. Bakıxanov yazırdı ki, tatlar Sasani şahları tərəfindən Albaniyanın şimal-şərqində müdafiə sədlərinin çəkilməsi ilə əlaqədar İrandan köçürülmüşlər[12]. Uzun əsrlər türklərlə birgə yaşamaq nəticəsində tatların xeyli hissəsi məişət və mədəniyyət cəhətdən yerli əhaliyə qaynayıb qarışmış və onlarda ikidillik yaranmışdır (Ətraflı məlumat üçün bax: Quliyeva, 18-31).

İrəlidə adı çəkilən mənbənin məlumatına görə Şabran mahalı Hüseynəli və Fətəli xanlar dövründə Muğandan və Azərbaycanın digər yerlərindən köçmüş sakinlər tərəfindən məskunlaşdırılmışlar, şiə məzhəbdirlər və qubalılar kimi türk dilində danışırlar[13].

Xanlığın bir neçə kəndində – Rustov mahalının Kilvar, Müşkür mahalının Birinci və İkinci Baraxum, Qaracalı, Böyük və Balaca Xaçmaz, Qaraqurtlu kəndlərində ermənі (onların bir qismi qriqoryan irandilli tatlar, digər qismi xeyli dərəcədə erməniləşdirməyə məruz qalmış albanlar, bir qismi də gəlmə ermənilər idi) yaşayırdı.

Quba şəhəri ilə üzbəüz Qudyalçayın əks sahilində Kulqat (bəlkə Gülhan – T. M. ) qəsəbəsində dağ yəhudiləri (yaxud yəhudi tatları) yaşayır, dörd ravinləri (ruhaniləri) və dörd sinaqoqları (məbəd) vardı[14].

XVIII-XIX əsrlərə kimi dağ yəhudiləri əsasən kəndlərdə, həm də başlıca olaraq dağ kəndlərində yaşayırdılar, əkinçiliklə və qismən də maldarlıqla məşğul olurdular. Yəqin elə dağ kəndlərində yaşadıqlarına görə Azərbaycanda yəhudiləri «dağ cuhudu» adlandırırdılar. Sonralar yəhudilərin bir çoxunun dağ kəndlərindən Quba şəhərinin ətrafına köçməsi ilə əlaqədar onları həm də «Quba cuhudu», yaxud «Quba yəhudisi» adlandırmağa başladılar.

Əyalətin ərazisinin böyük hissəsi əkinçilik üçün yararlı və münbit idi. Xəzər dənizi boyunca uzanan düzənlik əsas əkinçilik rayonu idi. Hələ XVIII əsrdə bu ərazidə olmuş səyyah M. Biberşteyn yazırdı ki, arası kəsilməyən müharibələr əkinçiliyə böyük ziyan vursa da, əhali əkinçilikdən əl çəkməmiş və özünə lazım olan miqdarda taxıl yetişdirirdi[15].



Bölgənin təbii-coğrafi və iqlim şəraiti burada tarixən kənd təsərrüfatının inkişaf etdirilməsi üçün əlverişli şərait yaratmışdır. Xanlığın yerləşdiyi ərazinin dəniz sahili mütamadi olaraq düzənliyə keçir. Düzənlik sahələr dəniz səviyyəsindən 20m hündür olub, getdikcə yüksəkliyi 100 metrə çatan düzən qurşaqla əvəz olunur ki, bu da Şimal-Şərqə meillidir[16].

Əyalət ərazisində mövcud olan Böyük Qafqaz dağlarının yamacları çox sıldırımlıdır. Bu yamaclar Quba şəhəri ətrafında 600m hündürlüklərdən başlayıb, yüksəkliklərə doğru ucalır. Bu hissədə Qusarçay, Qudyalçay, Qaraçay, Ağçay və Vəlvələçayın dərələri yerləşir. Xanlıq ərazisində ən hündür dağlar Bazar düzü (4485m) Şahdağ (4250m) və Babadağ (3632m) idi.

Bölgə ərazisinin dənizkənarı sahəsi Müşkür və Şabran düzlərini əhatə edirdi. Tədqiqatçıların fikrincə Müşkür düzünün adı uzaq keçmişlərdə Beşbarmaq dağı ilə Dərbənd arasında yaşayan «maskut»ə adlı tayfa birləşməsinin adından yaranmışdır (Aşurbeyli, 98). Vəlvələçay və Gilgilçay arasındakı Şabran düzünün adı isə ərəb işğalları dövründən məlum olan və XVII əsrə qədər Azərbaycanın mühüm iqtisadi və mədəni mərkəzlərindən biri olmuş Şabran şəhərinin adı ilə bağlıdır.

Dənizkənarı və düzənlik zolaqda qış yumşaq, yay isti və nisbətən quru keçir. Bu zonada əsasən şabalıdı və boz şabalıdı torpaqlar, dənizkənarında isə qumluqlar var. Düzən zonada əsasən əkinçilik və maldarlıq inkişaf etmişdi. Dağətəyi zonada torpaq şabalıdı, açıq şabalıdı, boz şabalıdıdır. Dağətəyi zonanın torpağı və iqlim şəraiti meyvəçiliyin inkişafı üçün çox əlverişli şərait yaradır. Burada alma, armud, gilas, alça, xüsusilə də alma ağacları çoxdur.

Əyalətin dağlıq hissəsində dağ-meşə, şabalıdı və qaratorpaq örtüyü var. Bu ərazidə iqlimin soyuq olması əkinçiliyin inkişafına imkan vermir. Bəzi dağ kəndlərində yazlıq taxıl (arpa, darı və az miqdarda buğda) əkilirdi.

Almanın bağçılıqda əsas yer tutması onun ilk növbədə başqa meyvə ağaclarına nisbətən məhsuldar olması və buna görə də iqtisadi baxımdan hər bir kəndli təsərrüfatı üçün əlavə gəlir verməsi ilə izah olunurdu[17].

Quba xanlığının Rusiyaya ilhaqından az sonra burada olmuş bir çar məmuru yazırdı: «Quba əyalətinin dənizdən içərilərə doğru uzanan 40 verstlik ərazisində bir neçə çay və arx vardır, burada buğda, arpa, darı və çəltik boldur»[18].

XIX əsrin 20-ci illərinin sonu-30-cu illərinin əvvəllərinə dair məlumata görə keçmiş Quba xanlığı ərazisində ildə 2. 392. 500 pud buğda, 930 min pud arpa, 196 min pud çəltik toplanırdı[19].

İqlim şəraiti, otlaqların bolluğu xanlıqda maldarlığın da inkişafına əlverişli şərait yaradırdı. Maldarlıq Şabran, Müşkür, Şeşpara və Beşbarmaq mahallarında daha çox inkişaf etmişdi. XIX yüzilin ilk otuzilliyinin əvvəllərində keçmiş Quba xanlığı ərazisində 27 min at, 50 min öküz, 40 min inək, 20 min camış və 250 min başdan çox qoyun var idi[20].

Xanlıqda meyvəçilik çox inkişaf etmişdi. Burada yetişdirilən meyvələrlə nəinki xanlıq əhalisi, eləcə də Bakı və Şamaxı şəhərləri təmin olunurdu. Aran yerlərində üzümçülüklə də məşğul olurdular[21].

Quba əyalətinin ümumi torpaq fondu 202852 ruba idi ki, bundan da 56543 ruba əkinə yararlı, 101071 ruba yararsız, 24362 ruba biçənək, 20876 ruba otlaq sahəsi idi. O zaman keçmiş xanlıq ərazisində olan mahallarda cəmi 14558 təsərrüfat olduğunu nəzərə alsaq, hər təsərrüfata təqribən 3,9 ruba əkinə yararlı torpaq sahəsinin düşdüyünü söyləmək olar. Mahallar üzrə götürdükdə Şabranda 1703 təsərrüfata 12580 ruba (adambaşına 7,4 ruba), Tip mahalı üzrə 1688 təsərrüfata 9990 ruba (adambaşına 6 ruba), Anaqdərə mahalında 1339 təsərrüfata cəmi 1028 (hər təsərrüfata 0,77 ruba), Yuxarıbaş mahalında 1057 təsərrüfata 1720 ruba (hər təs-ta 1,6 ruba) əkinə yararlı torpaq sahəsi düşürdü[22].

Ümumi torpaq fonduna nisbətdə əkinəyararlı torpaqların azlıq təşkil etməsi ən çoxu xanlıq ərazisinin meşələr və



kolluqlarla örtülmüş dağlardan ibarət olması ilə bağlı idi. Əkin sahələrinin azlığı həm də suvarma suyu çatışmadığından geniş münbit torpaq sahələrinin tamamilə istifadəsiz qalması ilə bağlı idi. Xanlıq ərazisindən axan çayların bir çoxu dərin dərələrdən axdığından, kəndlilərin əkin sahələri isə hündürdə dağlarda, dağ yamaclarında yerləşdiyindən suvarma çətinləşirdi. Suyun bölünməsi ilə mirablar və cuvarlar məşğul olurdular.

Bir sıra hallarda meşə yerləri açılır (qırılıb, yandırılır) əkin üçün yararlı hala salınırdı. Meşədən təmizlənmiş yer kiləvaxt (küləvaxt), kötüklük, baltalıq, yaxud tala adlanırdı. Əksərən belə yerləri tala adlandırdılar və buna görə də bu cür yerlərdə həyata keçirilən əkinçiliyə «tala əkinçiliyi» deyilirdi[23].

Torpağa qulluq çox bəsit səviyyədə idi. Gübrə kimi kül və qismən də mal peynindən istifadə olunurdu.

Növbəli əkin sistemindən istifadə olunurdu. Hər il əkin sahələrinin üçdə iki hissəsi dincə qoyulurdu. Dincə qoyulmuş sahədən otlaq və biçənək sahəsi kimi istifadə olunurdu.

Müharibələr, basqınlar, qarətlər kənd təsərrüfatına çox dağıdıcı təsir göstərirdi.

Əyalət əhalisinin təsərrüfatında heyvandarlıq da mühüm yer tuturdu. Heyvandarlıqda əsas yer maldarlığa məxsus idi. Mal-qara xanlığın təsərrüfat həyatında əvəzolunmaz rol oynayırdı. Qoşqu qüvvəsi kimi əkinçilikdə kəl və öküzlərin əvəzi yox idi. Maldarlıq həm də ev və sənətkarlıq sənayesinin mühüm xammal mənbəyi idi. Maldarlıqda iri və xırda buynuzlu heyvanlar çox önəmli yer tuturdu.

Əgər əkinçiliklə məşğul olan əhali iri buynuzlu heyvanları başlıca olaraq qoşqu heyvanı kimi istifadə etməklə qismən də qida mənbəyi kimi saxlayırdısa, elatlar iri buynuzlu heyvanları başlıca olaraq sənaye və ticarət məqsədləri üçün saxlayırdılar. Buna görə də əkinçilərin təsərrüfatının vəziyyəti iri buynuzlu heyvanların olmasından hədsiz dərəcədə asılı idisə, elatlar üçün bunu söyləmək olmaz. Buna görə də elat-

lar ən çox xırda buynuzlu heyvanlar saxlayırdılar. Xırda buynuzlu heyvanların saxlanması həm sənaye, həm də ticari əhəmiyyətə malik idi.

Maldarlıqda atların və eşşəklərin də öz yeri var idi. At əla nəqliyyat vasitəsi idi. Fasiləsiz feodal-ara müharibələri və düşmən basqınları şəraitində at döyüşlərdə minik vasitəsi rolunu oynayırdı.

Quba əyaləti əhalisinin mahallar üzrə təsərrüfat şəraiti, məşğuliyyət növləri, sosial tərkibi haqqında əyani məlumat almaq üçün «Kameral təsvir» əsasında cədvəllər tərtib etmişik və onları kitabın sonuna əlavə etmişik.

Qeyd edək ki, Quba əyalətinin kameral təsviri aşağıdakı şəkildə tərtib olunmuşdur və üst-üstə 4 min səhifədən şoxdur. Bu böyüklükdə təsviri olduğu şəkildə çap etmək çox çətin olduğuna görə, biz məzmunu olduğu kimi saxlamaqla formanı dəyişib çap edirik.

---

[1] Материалы для изучения экономического быта государственных крестьян Закавказского края (МИЭБГКЗК), т. 2, вып. I-II, Тифлис, 1986, с. 160.

[2] Yenə orada, s 161.

[3] МИЭБГКЗК, т. II, вып. I-II, с. 162.

[4] Yenə orada, s. 240-291.

[5] Yenə orada.

[6] Yenə orada, s. 352.

[7] Yenə orada.

[8] Yenə orada, s. 321.

[9] Архив Внешний Политики Российской Империи (АВПРИ), ф. 77, опись 7, дело 159, л. 35 и оборот.

[10] Yenə orada, vərəq 35-35 arxa tərəfi.

[11] Буниятов З. М. Несколько замечаний по поводу этнических процессов в Ширване (до первой трети XIII века)//Доклады АН Азербайджанской ССР, 1986, №4, с. 72.

[12] Бакиханов А. А. Гюлистани-Ирам (редакция, комментарии, примечания и указатели акад. З. М. Буниятова). Б. , 1991, с. 24.

[13] АВПРИ, f. 77, siy. 7, iş 159, v. 35 a. ü.

[14] Yenə orada.



[15] Бибирштейн М. Описание провинций расположенных на левом берегу Каспийского моря между реками Терек и Курой //AMEA A. Bakıxanov ad. Tarix İnstitutunun Elmi Arxivi, sənəd 466, s. 36-37.

[16] Почвы Азерабйджана. Б. , 1953, с. 35.

[17] Əliyev H. XIX-XX əsrin I yarısında Azərbaycanda bağçılıq (Quba-Xaçmaz zonasının materialları əsasında). T. e. n. dissertasiyası. B. , 1993, s. 35.

[18] Акты собранные Кавказской Археографической Комиссией (АКАК), том VI, Тифлис дополения, док. 61, с. 130-131.

[19] Обозрение Российских владений за Кавказом, т. IV, СПб. 1836, с. 52-53.

[20] Yenə orada, s. 136.

[21] Yenə orada, s. 133.

[22] Камеральное описание Кубинской провинции, чч. I-IV.

[23] Azərbaycan etnoqrafiyası (3 cilddə). I cild. (Ə. S. Sumbatzadə, İ. H. Əliyev və başqalarının redaktəsi ilə), B. , 1988, s. 42.

| Ailələr | Kəndlərin adları, ailə üzvlərinin adlar və onlar kimə məxsusdurlar | Adamların sayı (yaşları): Tatarlar (yəni azər-r) kişilər | Ermənilər kişilər | Ermənilər qadinlar | Yəhudilər kişilər | Yəhudilər qadinlar | Cəmi kişilər | Cəmi qadinlar | Hansı dinə etiqad edirlər | Hansı həyat tərzi keçirirlər, oturaq, yaxud tərəkəmə | Hansı işlə məşğul olurlar | Xəzinəyə vergi ödəyirlərimi, hansı vergini ödəyirlər, ödəmirlərsə, niyə? | Kəndin sərəncamında nə qədər yararlı və nə qədər yararsız torpaq sahəsi və biçənək, bağlar, bostanlar və s. var | Əvvəlki kameral siyaşıyaalmada qeydə alınmışlarmı, alınmamışlarsa, niyə? Kameral siyahıyaalmaya aidiyyəti olan təsadüfi halların izahı |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Almasyanlı kəndi | | | | | | | | Sünni məzhəbli müsəlmanlar | oturaq | taxılçılıq | Hər bir ailə xəzinəyə ildə 1 rubl 50 qəp. gümüş pul, 1 ruba buğda və yarım ruba arpa ödəyir | 20 ruba əkinə yararlı (bundan əlavə Yuxarıbaş mahalı Okuz kəndinin sakinləri tərəfindən zəbt olunmuş 100 ruba əkin sahəsi, 200 ruba əkinə yararsız sahə və 8 ruba biçənək 1dəyirman | Əvvəlki kameral siyahıya almada qeydə alınmamışlar, çinki belə siyahıyaalma keçirilməmişdir |
| 1 | Dadaş İsmayıl oğlu | 40 | | | | | 3 | | | | | | | |
| | Qardaşları: | | | | | | | | | | | | | |
| | 1.Sultanəhməd | 20 | | | | | | | | | | | | |
| | 2.Əlisultan | 15 | | | | | | | | | | | | |
| 2 | Alxas Əliqulu oğlu | 25 | | | | | 4 | | | | | | | |
| | Oğlanları: | | | | | | | | | | | | | |
| | 1.Atakişi | 8 | | | | | | | | | | | | |
| | 2.Ağabəy | 4 | | | | | | | | | | | | |
| | Qardaşı: Vəli | 15 | | | | | | | | | | | | |
| 3 | Hacı Səlim oğlu | 25 | | | | | 2 | | | | | | | |
| | Qardaşı: İsmixan | 5 | | | | | | | | | | | | |
| 4 | Şıxəli Hacı oğlu | 36 | | | | | 1 | | | | | | | |
| | | | | | | | 10 | | | | | | | |





I hissə

| Sıra | Mahal, şəhər və ya kəndin adı | Hansı səhifədə | Ailələrin sayı | Kişi və oğlanların sayı | Qadınlar və qızlar |
|---|---|---|---|---|---|
| 1 | 2 | 3 | 4 | 5 | 6 |
| | **Quba şəhəri** | 1 | 601 | 1801 | |
| | **Şəhər kənarı yəhudi qəsəbəsi** | 99 | 432 | 1432 | 1321 |
| | **I** | | | | |
| | **Müşkür mahalı** | | | | |
| 1. | Almasyanlı | 222 | 4 | 10 | |
| 2. | Tel | 223 | 28 | 69 | |
| 3. | Qasımkənd | 227 | 12 | 27 | |
| 4. | Nabran | 229 | 12 | 26 | 11 |
| 5. | Gal çaxllı | 231 | 16 | 42 | |
| 6. | Sarmar | 233 | 13 | 36 | |
| 7. | Köhnə Xaçmaz | 235 | 6 | 29 | |
| 8. | Bostançı | 237 | 33 | 122 | |
| 9. | Vələmir | 243 | 7 | 16 | |
| 10. | Təzə Baraxun | 245 | 7 | 26 | |
| 11. | Baraxun | 247 | 17 | 50 | |
| 12. | Dədəli | 250 | 16 | 57 | |
| 13. | Çaracan | 253 | 59 | 215 | |
| 14. | Mürşüd oba | 262 | 13 | 35 | |
| 15. | Şıx çobanlı | 264 | 4 | 9 | |
| 16. | Qaracalı | 265 | 16 | 56 | |
| 17. | Əzizli | 268 | 3 | 7 | |
| 18. | Gəncalı | 269 | 18 | 52 | |
| 19. | Naburlu | 274 | 24 | 54 | |
| 20. | Bəbəli | 272 | 8 | 24 | |
| 21. | Mirzəli qışlağı | 278 | 7 | 12 | |
| 22. | Bəbəşli | 277 | 8 | 24 | |
| 23. | Külüstan | 279 | 13 | 52 | |
| 24. | Qaraqutlu | 282 | 21 | 70 | |
| 25. | Qaraçı | 285 | 12 | 38 | |
| 26. | Ustancalı | 287 | 9 | 20 | |
| 27. | Loman | 288 | 10 | 21 | |
| 28. | Sərkər qışlağı | 289 | 11 | 38 | |
| 29. | Ləzgidibi | 241 | 1 | 3 | |
| 30. | Padar | 292 | 10 | 26 | |
| 31. | Armudu Padar | 294 | 10 | 28 | |
| 32. | Xaçmaz | 296 | 25 | 68 | |
| 33. | Səfər qışlağı | 302 | 3 | 11 | |

| | | | | | |
|---|---|---|---|---|---|
| 34. | Xaspulat qışlağı | 303 | 2 | 6 | |
| 35. | Talış Məhəmməd oba | 305 | 4 | 10 | |
| 36. | Dərviş Əli qışlağı | 305 | 4 | 10 | |
| 37. | Mehdi qışlağı | 306 | 4 | 6 | |
| 38. | Mirzə Abdal qışlağı | 307 | 3 | 9 | |
| 39. | Hacı Əlibəy qışlağı | 308 | 7 | 18 | |
| 40. | Qasım qışlağı | 309 | 7 | 9 | |
| 41. | Hacıkənd qışlağı | 310 | 23 | 66 | |
| 42. | Molla Borqanlı | 314 | 25 | 63 | |
| 43. | Şıxlar | 318 | 22 | 57 | |
| 44. | Küdarlı | 321 | 25 | 16 | |
| 45. | Digah | 325 | 7 | 20 | |
| 46. | Həbibkənd | 326 | 32 | 83 | |
| 47. | Qıraqlı | 331 | 17 | 68 | |
| 48. | Araz qışlağı | 337 | 11 | 29 | |
| 49. | Mürşüdqala | 339 | 8 | 18 | |
| 50. | Dəlləkkənd | 341 | 16 | 51 | |
| | **Müşkür mahalı üzrə cəmi:** | | **681** | **1997** | **11** |
| | II | | | | |
| | Tip | | | | |
| 1. | Mirzəməhəmmədkənd | 345 | 32 | 93 | |
| 2. | Küsmət qışlağı | 350 | 11 | 32 | |
| 3. | Əlibəy qışlağı | 352 | 13 | 49 | |
| 4. | Aqbil | 355 | 31 | 61 | |
| 5. | Xudat | 359 | 99 | 283 | |
| 6. | Tahir qışlağı | 374 | 2 | 5 | |
| 7. | Bədirqala | 375 | 57 | 147 | |
| 8. | Həsənqala | 383 | 59 | 218 | |
| 9. | Xuç qışlağı | 344 | 55 | 211 | |
| 10. | Çertana | 405 | 17 | 55 | |
| 11. | Alpan | 408 | 195 | 680 | |
| 12. | Gərəy | 442 | 16 | 64 | |
| 13. | Susay | 446 | 34 | 137 | |
| 14. | Küsmətbala | 453 | 13 | 53 | |
| 15. | Qımıl | 456 | 80 | 301 | |
| 16. | Üçgün | 472 | 40 | 146 | |
| 17. | Küpçal | 479 | 19 | 91 | |
| 18. | Qəçreş | 484 | 33 | 112 | |
| 19. | İspik | 490 | 35 | 128 | |
| 20. | Möhüç | 497 | 21 | 86 | |
| 21. | Təkər Şıxı | 502 | 50 | 149 | |
| 22. | Yengikənd | 510 | 30 | 117 | |
| 23. | Tüləkəran | 516 | 9 | 36 | |
| 24. | Soltəkəli | 518 | 14 | 29 | |





| | | | | | |
|---|---|---|---|---|---|
| 25. | Tullar | 520 | 8 | 26 | |
| 26. | Alıc | 522 | 48 | 148 | |
| 27. | Qrmek | 530 | 14 | 49 | |
| 28. | Köhnə İqrıq | 533 | 19 | 66 | |
| 29. | Amsar | 537 | 62 | 211 | |
| 30. | Qazmalar | 550 | 16 | 43 | |
| 31. | Nüqədi | 552 | 215 | 808 | |
| 32. | Pirvahid | 589 | 23 | 80 | |
| 33. | Rəsul qışlağı | 593 | 5 | 18 | |
| 34. | İqrıq | 594 | 52 | 135 | |
| 35. | Qaçar | 601 | 11 | 31 | |
| 36. | Arzuman qışlağı | 603 | 31 | 98 | |
| 37. | Zizik | 608 | 119 | 359 | |
| | **Tip mahalının cəmi:** | | **1588** | **5347** | |
| | **Bütövlükdə birinci kitabda** | | **3303** | **10577** | |
| | **Kollej reqistratoru** | | | | |
| | **Xotyanovski** | | | | |

## I. Müşkür mahalı

### 1. Almasyanlı kəndi - xəzinəyə məxsus (v. 3. arxa üzü -4.)

Rəiyyətlər:
1. Dadaş İsmayıl oğlu– 40, qard. Sultan Əhməd– 20, Əli Sultan– 15
2. Alxas Əliqulu oğlu– 25, oğlu– Atakişi– 8, Ağabəy– 4, Alxasın qard. Vəli– 15
3. Hacı Səlim oğlu– 25, qard. İsmayıl – 5
4. Şıx Əli Hacı oğlu – 36

Kənddə cəmi 10 nəfər sünnü məzhəb kişi və oğlan qeydə alınmışdı. Sakinlər oturaq həyat tərzi keçirir və taxılçılıqla məşğul olurdular. Hər ailə xəzinəyə ildə 1 rubl 50 qəp. gümüş pul, 1 ruba buğda və 0,5 ruba arpa verirdi. 20 ruba taxılı səpməyə uyğun yararlı torpaq sahəsi: bundan əlavə Yuxarıbaş mahalının Kürə kəndinin sakinləri tərəfindən zəbt olunmuş 100 rubalıq yararlı torpaq sahəsi vardı. 200 ruba yararsız sahəsi vardı; Biçənək- 8 ruba; dəyirman- 1 ədəd.

### 2. Tel kəndi - xəzinəyə məxsus (v. 4. a. ü. -7)

1. Kəndxuda Balarza Hacı Qurban oğlu– 40, oğlu– Qonaq bəy– 8, qard. oğlu Abdulla Ramazan oğlu– 20,

Rəiyyətlər:
2. Dəmirxan Məhəmməd oğlu– 25. qard. Qurban – 20, Bayraməli – 15
3. Məlik Nur Məhəmməd oğlu– 50, oğlu: Nurməmməd – 20, Yarməmməd– 10, Muradxan – 5, Məhəmməd – 3, Məlik Nurməmmədin qard. Dostməmməd Xanməmməd oğlu – 10
4. Murad Ağaməmməd oğlu – 50. oğlu: Bayram – 25, Uruz – 15,
5. Məhəmməd Şərif oğlu – 30
6. Əsgər Şərif oğlu – 25, qard. İskəndər – 20, Rüstəm – 15
7. Balakişi Qoca oğlu – 40



8. Əsır İlyas oğlu – 50, oğulları: Bayraməli – 20, Sultan-15, Mənsum-6, Qurbanəli – 3
9. Məhəmməd Yaqubxan oğlu – 40, oğulları: Balakişi-7, Murtuza-10 günlük, Məhəmmədin qard. Atakişi – 20
10. Aydəmir Ramazan oğlu – 9
11. Mustafa Qoca oğlu – 20
12. Manaf Sail oğlu – 50, oğulları: Əli – 20, Niftalı – 15, Paşa – 10
13. Əsgər Sultan oğlu – 35
14. Ağakişi Həlim oğlu – 40, oğulları: Xankişi – 12, Haşım – 8
15. Daşdəmir Yusuf oğlu – 20, qard. Məhsum – 16
16. Məhəmməd Xudaverdi oğlu – 30, oğlu: Pirmurad-10
17. Qarabəy Kiçibəy oğlu – 25
18. Qəmbər Abdulla oğlu-40
19. Eldar Yusuf oğlu – 17, qard. Süleyman – 3
20. Atay Hüseyn oğlu – 4. (Azyaşlı olduğuna görə vergi vermirdi)
21. Novruz Məhəmməd oğlu – 40, oğlu: Məhəmməd – 3, Ələsgər – 2
22. Məlik Saleh oğlu – 30, qard. Pirim – 25, Aslan – 20
23. Mustafa Ağababa oğlu – 35, oğlu Allahverdi – 8
24. Əsgər Şərif oğlu – 35, qard. İskəndər – 20, Rüstəm – 18
25. Hacıməmməd Vəlihəsən oğlu – 55

Hərbi nökərlər:
26. Əli Məhəmməd oğlu – 40, qard. Məhərrəm – 25
27. Şaban Yusuf oğlu – 30, qardaşları Yusuf – 25, Həsən – 20

Vergi ödəməyən rəncbərlər:
28. Musa Əbdül oğlu – 30, oğlu Ağarəhim – 8, Musanın qard. Cəbrayıl – 20, Temirxan – 15

Kənddə cəmi 69 nəfər sünnü məzhəb kişi və oğlan qeydə alınmışdı. Sakinlər oturaq həyat tərzi keçirir və taxılçılıqla, qismən də ipəkçilik və xalçaçılıqla məşğul olurdular. Bir il ərzində xəzinəyə kəndxuda 3 rubl 50 qəp. gümüş pul, kəndlilər isə hər ailədən 1 rubl 50 qəp. üstəlik 1 ruba buğda və 0,5 ruba arpa ödəyirdilər. Kənddə 100 ruba

səpin üçün yararlı, 200 ruba yararsız, 50 ruba biçənək vardı. 6 tut bağı, 1 dəyirman, 1 ding vardı.

### 3. Qasımkənd kəndi - xəzinə məxsus (v. 8 a.ü -10. )

Kəndxuda:
1. Qasım İbrahim oğlu– 30
Rəiyyətlər:
2. Ələsgər Əbuşərif oğlu – 20, qard. Əbdülkərim – 2
3. Əbdüləziz Hacı Mütəllim oğlu – 35, qard. - 30
4. Əli Nəzər oğlu – 40, oğlu: Səfər – 13, Bağır – 3. Əlinin qard. Dəmir - 35
5. Xanməmməd Bürcüm oğlu – 60, oğlu: Mirzəmməd – 10
6. Əmirhəmzə Məmmədşərif oğlu – 20, qard. – 15
7. Ramazan Xanüb oğlu – 30, oğlu Allahverdi – 5. Ramazanın qard. Tarverdi-8
8. Xan Əmir Fərman oğlu – 40, qard. oğlu Nəzir – 15
9. Səməd Xan Əmir oğlu – 16
10. Babaxan Xan Əmir oğlu – 30, qard. Kərim - 2
Seyidlər:
11. Seyid Yunus Seyid Nur oğlu – 40, oğlu: Seyid Vəli – 10, Seyid Kamil – 3
12. Seyidbaba Seyidqabı oğlu – 30, oğlu Seyid Əşrəf – 3, qard. Hacıbaba - 25

Cəmi 27 sünnü etiqadlı müsəlmanın qeydə alındığı Qasımkənd kəndinin əhalisi oturaq həyat tərzi keçirərək, taxılçılıq və maldarlıqla məşğul olurdular. Xəzinəyə kəndxuda ildə 3 rubl 50 qəp. , hər rəiyyət ailəsi 1 rubl 50 qəp gümüş pul, üstəlik hər rəiyyət ailəsi 1 ruba buğda və 0,5 ruba arpa ödəyirdi. Taxılçılıq üçün yararlı 50 ruba, yararsız 60 ruba, 20 ruba biçənək yeri, 5 tut bağı vardı.



### 4. Nabran kəndi

### Rüstəm bəy Mirzə bəy oğlunun idarəsində idi

### (v. 10 a. ü. -11)

Rəiyyətlər:
1. Daşdəmir Əlibəy oğlu – 40, oğlu: Əlibəy – 15, Qonaqbəy – 4
2. Şamxal Ramqal oğlu – 30, oğlu Qədir – 4
3. Mirzə Əmiraslan oğlu – 25, qard. Uruz – 20
4. Murtuzəli Məhərrəm oğlu – 18 qard. Məmmədəli–10, Sultanəhməd-5
Vergi ödəməyən rəncbərlər:
5. Şamxal Esembəy oğlu – 25 qard. oğlu Səfər – 8
Yəhudilər:
6. İsmayıl Molla İlyas oğlu– 47. Arvadı– Qızistər– 32, oğlu: Yaqub-8 Süleyman-4
7. İbrahim İlyas oğlu – 32, arvadı Pəri – 21 oğlu Cəmil-5, qızı Rahal-4
8. Şaban İlyas oğlu – 45, arvadı Qana – 33, oğlu: İlyaqu-7 qızları: Qana – 4, Uruqa-3
9. Yaquda Zaval oğlu – 40, arvadı Biça-40, qızları Balaxis – 12
10. İbrahim Nəzər oğlu-34, arvadı Teymatı-28, oğlu: İlyazır-7, Nəzər-3 qızları: Pəri – 4
11. Səədi Qalaks oğlu – 25 qard. İqoğul – 20
12. Burar Eskiya oğlu – 36 arvadı Gülbahar

Nabran kəndində 12 nəfər sünnü məzhəb kişi və oğlan və 37 yəhudi (26 kişi və 11 qadın) qeydə alınmışdı. Kənd əhalisi oturaq həyat keçirir və taxılçılıqla məşğul olurdu. Hər ailə xəzinəyə ildə 1 rubl 50 qəp gümüş pul, 1 ruba buğda və 0,5 ruba arpa ödəyirdi. 100 ruba yararlı əkin yeri, 200 ruba yararsız sahə var idi. Bundan əlavə kəndin ərazisində xanlıq dövrü qaydası ilə Tin mahalının Alpan kəndinin sakinlərinin istifadəsində olan 1200 ruba yararlı və 1500 ruba yararsız sahə var idi. Kənddə bir tut bağı, bir dəyirman və bir ding vardı.

Bu kəndin idarəsinin Quba xanı tərəfindən Mirzə bəy Rüstəm bəy oğluna verilməsi barədə sənəd vardı. Mirzə bəy öldükdən sonra kəndin idarəçiliyi praporşik və mahal naibi Rüstəm bəyə keçmişdi. Bəy kəndin gəlirlərinin bir hissəsini özünə toplayırdı.

**5. Çaxçaxlı kəndi**
**Məlik Məmməd bəyin idarəçiliyində**
**(v. 12 a. ü. - 14)**

Kəndxuda:
1. Əhməd Pirverdi oğlu-50 oğlu: Hakim-16, Əlibəy-4, Məmmədbəy-1 aylıq.
Rəiyyətlər:
2. Yaqub İbrahim oğlu-40, oğlu: Əli-6, Rəsul-4 Yaqubun qard. Qədir- 2, Yaqubun qard. oğlu İbrahim – 3
3. İslan Aslan oğlu – 25, qard. Osman – 6
4. Şıx Manaf Yusuf oğlu – 50, oğlu: Məhəmməd – 15, Şıxəhməd – 9, Yusif – 7 5. İbrahim Baba oğlu – 52, oğlu: Məhəmməd – 12, Hüseyn – 4
6. Şıx İskəndər oğlu – 30 oğlu: Şeyda – 15 Şıxəli – 8
7. Pənah Pirverdi oğlu – 35
8. Kərim Əbdülkərim oğlu – 8 qard. Dadaş – 5, Yaqub – 3
9. Əbdül Mirzə oğlu – 40, oğlu Qasım – 9
10. Mirzə Seyid Məmməd oğlu – 30
11. Bayram Əliməmməd oğlu – 25, qard. Bədəl – 5
12. Məmmədəli Əhməd oğlu – 60, oğlu: Candəmir – 28, Teymur-25
13. İsmayıl Babay oğlu – 45, oğlu Daşdəmir – 12
14. Əbdül Məmmədbəy oğlu – 30 oğlu Məmmədbəy – 5
Rəncbərlər:
15. Mahmud Pirverdi oğlu – 45 oğlu Hacıbəy – 25
16. Aydəmir Mustafa oğlu – 15 qard. Tarulla – 10 Fərzəli – 8

Kənddə cəmi 42 nəfər sünnü məzhəb kişi və oğlan qeydə alınmışdı. Sakinlər oturaq həyat tərzi keçirir və taxılçılıq, maldarlıq və ipəkçiliklə məşğul olurdular. Kəndxuda ildə xəzinəyə 3rubl. 50 qəp, hər rəiyyət ailəsi 1



rubl. 50 qəp ödəyirdi. Hər rəiyyət ailəsi həm də 1 ruba buğda və 0,5 ruba arpa ödəyirdi. Kənd ərazisində 250 ruba yararlı, 200 ruba yararsız, 50 ruba biçənək, 10 tut bağı, 1 dəyirman və 1 ding vardı.

Kənd çar Rusiyası tərəfindən Hüseyn bəyə vermişdi. O öldükdən sonra isə oğlu Məlikməmməd bəyin idarəçiliyinə keçmişdi. O, gen. Yermolovun sərəncam verdiyi bütün gəlirlərdən istifadə edirdi.
Bir nəfər – Kərim Əbdülkərim oğlu azyaşlılığına görə vergidən azad idi. Bayraməli Məmmədyusuf oğlu yoxsulluğuna cörə vergi ödəmirdi.
Rəncbər Mahmud Pirverdi oğlu xəzinəyə ildə 4 rubl gümüş pul ödəyirdi. Rəncbər Aydəmir Mustafa oğlu isə vergidən azad rəncbərlər sırasına daxil idi.

**6. Şorlar kəndi - xəzinəyə məxsus**
**(v. 14 a. ü. -15)**

Kəndxuda:
1. Əlisultan Bayram oğlu–35, qard. Aydın– 30, qard. oğlu: Həsənbəy– 20, Hacıbəy– 25, Əli Abbas– 11, Şıxbaba – 10
Rəiyyətlər:
2. Mirzə xan Rzaxan oğlu – 40, qard. Ağacan – 20, Arzuxan – 10
3. Ramazan Bürcüm oğlu –40, oğlu: Bürcüm –10, Hacıbuqan –Buqan –2, 4. Ramazanın qard. Ramaldan –20
4. Məmmədvəli Ağabəy oğlu –30
5. Ağa Məhəmməd Rəhimxan oğlu –50
6. İbrahimxan Ağaməhəmməd oğlu –5
7. Əlixan Emin oğlu –40
8. Xeyirbəy Tahirbəy oğlu 8
9. Əli Babaxan oğlu –30
Namnauzlar[1]:

---

[1] Namnauzlar (namnəviz (farsca adı yazılmış sözündən) hərbi əməliyyatlar zamanı tam silahlanmış şəkildə xanın süvari qoşununda vuruşurdular. Buna görə də heç bir digər mükəlləfiyyətlər daşımır və vergi ödəmirdilər.

10. Xanməmməd Xəlil oğlu-50 oğlu: Mahmud-20, Səfər-15, İsmayıl-10, Behbud-5.
Namnauzlar:
11. Mirzə Məmməd Əhməd oğlu-50, oğ-rı: Əhməd-15, Əlibəy 8, qard. Oğ-rı: Əlisultan Xasməmməd oğlu, Ağası Xasməmməd oğlu;
12. Seyid Novruz oğlu-30 qard. Oğ-rı - Məlik Taşçı oğlu-3;
13. Fətəli Nağı oğlu-20 qard-rı. Mustafa- 10, Niftalı-8,Tağı-4.
Cəmi 36 kişi xeylağının qeydə alındığı sünnü məzhəbli kənd sakinləri oturaq həyat tərzi keçirir və taxılçılıq, maldarlıq və ipəkçiliklə məşğul olurdular. Kəndxuda ildə xəzinəyə 3 rub, 50 qəp, gümüş pul, rəiyyətlər hər ailə 1 man 50 qəp, və 1 ruba buğda, 0,5 ruba arpa ödəyirdilər. 2 nəfər azyaşlılığına görə vergi ödəmirdi. Taxılçılığa yararlı torpaq sahəsi 110 ruba əkin yeri, yararsız 100 ruba sahə, 50 ruba biçin yeri, 4 tut bağı vardı.

### 7. Köhnə Xaçmaz kəndi
### Cavad bəy Qazarovun idarəçiliyində
### ( v. 16 a. ü. – 17 a. ü. - 18)

Rəiyyətlər:
1. Məmmədhəsən Novruz oğlu – 25 qard. Mirzə-10
2. Zeynal Əbdülməmməd oğlu – 60 oğlanları Məmmədəli-35, Tağı-30, Sadıq-25, Əsgər-23, Nəvələri: Həsən-7, Möhübəli-3, Abbasəli-7, Mehrəli-3, Günəş-6 aylıq.
Rəncbərlər:
3. İsmayıl Əlixan oğlu-50 oğlu: Qədir-25, Musa-10, Məmmədkərim-8, Qasım-7, Yusif-3 aylıq. Nəvəsi İsa-7.
4. Əbdülbaqi Tağı oğlu – 50 oğlanları : Abdulla-12, Bayrambəy-9. Əlisultan8
5. Mərdalı Rüstəm oğlu-35, qard. Ramazan-30, qard. oğlu: Rüstəm Kəlbəli oğlu-16, Umaxan-6.
6. Ağakişi Allahverdi oğlu-30, qard. Cəmil-26.

---

Çar hökuməti namnauzların üzərinə pul vergisi qoymuşdu. Bax: Колониальная политика Российского царизма в Азербайджане в 20-60 годах XIX века ч. I, М-Л. 1936, с. 84



Cəmi 29 sünnüməzhəb müsəlman kişinin və oğlanın yaşadığı bu kəndin sakinləri oturaq həyat sürür, taxılçılıqla məşğul olurdular. Hər ailə xəzinəyə ildə 1 man 50 qəp. gümüş pul, 1 ruba buğda və 0,5 ruba arpa ödəyirdi. Rəncbərlər vergi verməyən rəncbərlər kateqoriyasında olduqlarına görə heç bir vergi ödəmirdilər. Kəndin əkin üçün yararlı 300 ruba sahəsi, yararsız 100 ruba, 50 ruba biçin yeri vardı. 2 tut bağı, 1 dəyirman, 1 ding vardı. Kəndin ərazisində Tip mahalı Həsənqala kəndinin sakinlərinin xan təliqəsi əsasında istifadə etdikləri 600 ruba əkinə yararlı, 1000 ruba isə yararsız sahə vardı.

Köhnə Xaçmaz kəndi xan hakimiyyəti tərəfindən irsi keçmək hüququ ilə Qadir bəyə verilmiş, onun ölümündən sonra oğlu Cavad bəyin sərəncamına keçmişdi. Bu kəndin yanında xəzinəyə məxsus 4 tut bağı vardı, icarəyə vermirdilər. Üç rəncbər ailəsi Cavad bəyə, 1 ailə isə Məmmədrəhim Rəsul oğluna verilmişdi.

### 8. Bostançı kəndi - xəzinəyə məxsus
### (v. 18 a. ü. - 24)

1. Kəndxuda: Qasım Əziz oğlu– 50, oğlu: Ağa-20, Xələf-3, Qasımın qard. oğlu Əli Əli oğlu-2, Qasımın atası Əziz Hacı Abdulla oğlu- 90.
Rəiyyətlər:
2. Hacıbəy Allahverdi oğlu-40, oğlu Allahverdi-15, qard. Əlməmməd-30.
3. Gərayxan Qara oğlu-20, oğlu Vəlican-4, Gərayxanın qard. oğlu: İsmixan Məmmədxan oğlu-12, Sadıq Məmmədxan oğlu-6.
4. Rəfi Gül oğlu-50, oğlu Səfər – 16.
5. Əbdürrəhman Əbdülkərim oğlu–30, qard. Əbdürrəhman-20, Pənah-15
Xanməmməd Kərim oğlu-20, qard. Süleyman-15.
6. Məhəmməd İsmayıl oğlu-25, oğlanları Ələkbər-7, Qonaq-4, Məhəmmədin qard. oğlu: Aslan-20, Əhməd-15.
7. Məmmədqulu Məmmədvəli oğlu-50, oğlu: Niftalı-18, Fərzalı-15, Nurəli-6.

8. Nazir Məhəmməd oğlu-25, qard. oğlu: Əziz-20, Əhməd-14, Osman-5
9. Qonaqxan Gəldi oğlu- 25, oğlu Şirin-2.
10Qonaqxanın qard. oğlu: Əsgər-18, Əkbər-14. Şahgəldi-7.
11. Bayraməli Abgül oğlu-20, oğlanları Yunus – 8. Məhəmməd-4
12. Məlik Qulu oğlu-40, oğlu Yəhya-8
13. Şıxəli Kərim oğlu-25
14. Əhmədxan Bayrambəy oğlu-20
15. Seyid Məhəmməd oğlu-19
16. Hacıəhməd Əbdülkərim oğlu-30, oğlu Abdulla-6
17. Əli Məhəmməd oğlu-7
18. İsmayıl Gül Qulu oğlu- 25, oğlu Sultan Əhməd-3
19. Oruc Oruc oğlu-50
20. Mirzə Məmməd Məhəmməd oğlu-8, qard. Məhəmməd Rza-5
21. Cəlil Məhəmməd oğlu-30, oğlu Dəmirxan –2
22. Həsən Həsən oğlu-18
23. Udulah Akay oğlu –20, qard. Kazlay-18, İbrahim –6

Hərbi nökərlər:

24. Qədir Əziz oğlu –40, qard. Eyvaz-7 Şahbaz –4 Bolubəy- 8 aylıq, Qədirin qard. Dadaş-50, Qədirin qard. oğlu: Yaqub-15, Herat-10, Bədəl Dostu oğlu-25, Mustafa-20, Qazı-10, Xasməmməd Ağakişi oğlu-20, Fətəli-8
25. Abdulla Şefim oğlu-70, qard. Rza –50, qard. oğlu: Mirzə Əbdürrəhman oğlu-18, Bəşir Əbdürrəhman oğlu-17, Nəsir Əbdürrəhman oğlu-9, Abdullanın nəvəsi Abgül Pirməmməd oğlu-11
26. Şıxməmməd Seyid oğlu-25, qard. Gülməmməd –15
27. Kərim Hacı oğlu-60, oğlanları İsa-18, Əyyub-6, Qoca-3, Kərimin qard. Rəsul-30, qard. oğlu: Musa Rəsul oğlu-6, Məlik Mənsum oğlu-6. İbrahim Xəlil oğlu-14.
28. Əhməd Əli Məmmədvəli oğlu-30, oğlu: Allahqulu-6, Kərim-4, Əhmədin qard. Hacı Əli-25, qard. oğlu: Məmmədvəli Hacıəli oğlu-5, Ağaəli-4, Dədə Bəy oğlu-24.

Rəncbərlər:



29. Xələf İsmayıl oğlu-40, oğlu: Qasım – 8, Paşa-3, Xələfin qard. Əziz-30, Sultan-20, Xələfin qard. oğlu Mehdi Əziz oğlu-5.
30. Xasməmməd Təhməz oğlu-60, oğlu: Mustafa-30, Məhəmməd-29, Daşdəmir-28, Niftalı-16. nəvə: Bayraməli Mustafa oğlu-9, Murtuzəli Mustafa oğlu-5.
31. Gəncalı Emin oğlu-25, oğlu: Emin-4, əmisi oğlu Qulu Məhəmməd oğlu-35, Gəncalının qard. oğlu: Daşdəmir-16, Aydəmir-12, Xandəmir-8, Əziz-5, Qədir-4.
32. Xanməmməd Xanəhməd oğlu-25, qard. oğlu Məmməd Xəlil oğlu-10.
33. Tahir Əbil oğlu-20, qard. Tayib-16, qard. oğlu: Məhəmməd Səlim Əbu Səlim oğlu- 8, Baba Məhəmməd oğlu-10, Eyyub – 7.

Cəmisi 122 nəfər sünnü məzhəb kişi və oğlanın qeydə alındığı bu kəndin əhalisi oturaq həyat keçirirdilər. Taxılçılıq, ipəkçilik və heyvandarlıqla məşğul olurdular. Kəndxuda xəzinəyə ildə 3 rubl 50 qəp. gümüş pul, kəndlilərin hər biri 1 rubl 50 qəp. və 1 ruba buğda, 0,5 ruba arpa ödəyirdilər. Kənddə taxılçılıq üçün yararlı 300 ruba səpinlik sahə, yararsız 300 ruba sahə var idi. 30 tut bağı, 3 dəyirman, 2 ding vardı. Bundan əlavə kəndin ərazisində Tip mahalının Bədirqala kəndinin sakinlərinin istifadəsində olan 500 ruba əkinə yararlı və 500 ruba yararsız sahə vardı.

Əhmədxan Bayraməli bəy oğlu yoxsulluğuna görə, Seyid Məhəmməd oğlu, Əli Məhəmməd oğlu, Mirzə Məmməd Məhəmməd oğlu isə azyaşlılığına görə vergi ödəməkdən azad idilər. Hərbi nökərlər də vergilərdən azad idilər. 4 rəncbər ailəsinin hər biri xəzinəyə ildə 4 rubl gümüş pul ödəyirdilər. Birinci 3 rəncbər rus hökuməti tərəfindən Xəlil bəyə, dördüncü isə Əlmurad bəyə verilmişdi. Tahir Əbil oğlu vergi ödəməyən rəncbərlər sırasına daxil olduğu üçün vergilərdən azad idi. Rus hökuməti bu ailəni Qədir Əziz ağaya vermişdi.

## 9. Vələmir kəndi - Yəhya bəyin idarəsində (v. 24 a. ü. - 26)

Rəiyyətlər:
1. Yusuf İbrahim oğlu-30
2. Rza Allahverdi oğlu-40, oğlu Murad-20
Namnauzlar:
3. İbrahim Əhməd oğlu-35, qard. oğlu Həsən İsmayıl oğlu-5 Qasım Şıxzada oğlu-5
Rəncbərlər:
4. Məmmədtahir Əlibəy oğlu-50
5. Tahir Allahverdi oğlu-50, oğlu: Allahverdi-25, Murtuzəli-15, Əkbər-7.
Hərbi nökər:
6. Rüstəm Məmmədsəlim oğlu-50, oğlu: Şirin-10, Sultan-7, Məmmədrəhim-5.
7. Oğulluğu Hüseyn-20.

Cəmi 16 nəfər sünnüməzhəb kişi və oğlanın qeydə alındığı bu kəndin əhalisi oturaq həyat keçirir, taxılçılıq və ipəkçiliklə məşğul olurdu. Rubalıq əkinə yararlı, rubalık əkinə yararsız sahə var idi. Hər bir rəiyyət ailəsi xəzinəyə ildə 1 rubl 50 qəp. gümüş pul, habelə 1 ruba buğda və 0,5 ruba arpa ödəyirdi. Birinci namnauz ildə 8 rubl gümüş pul ödəyirdi, ikinci namnauz isə pul ödəmirdi. Tahir Allahverdi oğlu vergidən azad rəncbərlər kateqoriyasına daxil idi. Bu kənd xanlar tərəfindən Yəhya bəyin sələflərinin idarəsinə verilmişdi. İdarəçi kəndin gəlirlərindən istifadə edirdi. Məmməd Tahir çar hökuməti tərəfindən Nurməmməd bəy Əhməd bəy oğlunun ömürlük qulluğuna verilmişdi. Rüstəm Məmmədsəlim oğlu hərbi nökər olduğuna görə vergi ödəmirdi.

### 10. Təzə Baraxum kəndi - xəzinəyə məxsus (v. 2 a. ü. -28)

1. Məşədi Mirzə Baba oğlu-50, oğlu: Həsən bəy-15, Oruc-10, Bədəl-8, Mursali-5, Ağabəy-2
2. Ramazan Hacı Mirzə oğlu-40, oğlu: Məhəmməd-15, Rüstəm-4, Ramazanın qard. oğlu Mirzə-25.
7. Fərzəli Şıxkərim oğlu-40, oğlu Məmməd Kərim-10, qard. Ağakərim-30.



4. İmamverdi Taxtu oğlu-35, oğlu: Hüseyn-10, Qaraxan-7.
Rəncbərlər:
5. Əli Mənsum Əli oğlu-45, oğlu: İskəndər-5, Abbasəli-3.
6. Nəbi İbrahim oğlu-50, oğlu: İskəndər-22, Nəbi-14, Oruc-10, Rəşid-1
7. Daşdəmir Sultan oğlu-19, qard. Xanəhməd-15.

Təzə Baraxum kəndində cəmi 26 nəfər sünnüməzhəbli kişi qeydə alınmışdı. Sakinlər oturaq həyat keçirir, taxılçılıq və ipəkçiliklə məşğul olurdular. Hər ailə xəzinəyə ildə 1 man. 50 qəp. gümüş pul, 1 ruba buğda və yarım ruba arpa ödəyirdi. Kənddə 200 ruba yararlı torpaq sahəsi, 300 ruba yararsız, 40 ruba biçənək sahəsi, 5 tut bağı var idi. Bu kənddə xəzinəyə məxsus 3 tut bağı var idi. Müqaitəyə verilmişdilər. Kənddəki 3 rəncbər ailəsi vergilərdən azad idi. Bu üç ailə 1827-ci ildə polkovnik Ağabəy Sadıqova verilmişdi.

### 11. Baraxum kəndi - xəzinəyə məxsus (v. 28 a. ü. - 31)

Kəndxuda:
1. Qasım Süleyman oğlu-40, oğlu: Şahbaz-8, Şərif-4; Qasımın qard. Qurban-30; Qasımın əmisi Bayraməlinin oğlu: Kərim-30, Səlim-20, Ağası-10, Niftalı-9, Hüseynəli-8, Məhsum-7, Əsgər-6
Rəiyyətlər:
2. Məhərrəm Məmmədəli oğlu-30, oğlu: Şıxəli-4 Ələsgər-1
3. Əli Pənahəli oğlu-15, qard. Murad-13, Əli Məmməd-6
4. Həsən Əbdürrəzzaq oğlu-30,oğlu Hüseyn-2;qardaşı Qurbanəli-15
5. Ağa Səfər oğlu-30; oğlanları; Səfərəli-5, Novruzəli-3, Hacəli-2, Mursəli-1
6. Dostməmməd Əlimirzə oğlu-31; oğlu Əlimirzə-2; qard. Abdulla-20; əmisi oğlu İsa-4
7. Xanməmməd Məhəmməd oğlu-10
8. Hacımirzə Məmməd oğlu-6; qard. Ağarza-3
9. Hüseynəli Qurbanəli oğlu-9
10. Məhərrəm Qədir oğlu-14

11. Mirzə MəmmədƏkrəm oğlu-7
12. İmam Nəzər Məmmədəli oğlu-50; oğlu Əli-15
Rəncbərlər:
13. İbrahim Məmmədəli oğlu-40; oğlu: Allahverdi-15, İmaməli-10, Əhməd-3
14. Əhməd Səfər oğlu-30; oğlu Nurməmməd – 10; qard. oğlanları Məhəmmədəli-4, Qonaqbəy-2
15. Qədir Ağamirzə oğlu-20; qard. Nəzir-15
16. Xasməmməd Bayram oğlu-30; oğlu Bayram-3
17. İbrahim Mustafa oğlu-1

Kənddə cəmi 50 nəfər sünnüməzhəbli kişi və oğlan qeydə alınmışdı. Kəndin sakinləri oturaq həyat tərzi keçirir, taxılçılıq və ipəkçiliklə məşğul olurdular. Kəndxuda xəzinəyə ildə 3 rubl 50 qəp. gümüş pul, rəiyyətlərin hər biri 1 rubl 50 qəp. , 1 ruba taxıl və yarım ruba arpa ödəyirdilər. Kənddə 300 ruba yararlı əkin sahəsi, 300 ruba yararsız torpaq, 40 ruba biçənək, 15 tut ağacı, 1 dəyirman və 1 ding vardı.

4 kəndli ailəsi azyaşlı, 1-i yoxsul olduğuna görə vergilərdən azad idilər. 5 rəncbər ailəsi də vergilərdən azad idi. 1 rəncbər ailəsi Əlmurad bəyə, biri Məhəmməd Tağı bəyə, ikisi isə Xəlil bəyə ömürlük verilmişdi.

### 12. Dədəli kəndi - Əlmurad bəyin idarəsində idi (v. 31 a. ü. - 34)

Kəndxuda:
1. Osman Yusif oğlu-45. oğlu: Mirzə Məmməd-15, İsa-12, Musa-9, Aslan-7, Harun-3; Osmanın əmisi oğlu Qadir Mirzə Məmməd oğlu-30, Osmanın qard. oğlu: Qeyrət-5, Yusuf-3
Rəiyyətlər:
2. Əhməd Şıxrəcəb oğlu-40, oğlu Baxış-1
3. İsmayıl Sultanmurad oğlu-45, oğlu Ağakərim-10
4. Sultan Süleyman oğlu-30; oğlu: Məmmədyar-8, Mahmud-5, Adyar-1
5. Orduxan Əhməd oğlu-28, oğlu Əhməd-1; əmisi uşaqları: Orduxan Çoban oğlu-5, Nuhəli Baba oğlu-4
6. Arux Babat oğlu-43, oğlu Mustafa-10



7. Mirzə Mirzə oğlu-60
8. Əbdül Kərim Oruc oğlu-25, oğlu Cabbar-3; əmisi oğlu Əli Şıxsəfərxan oğlu-15
Rəncbərlər:
9. Mehrəli Mehrəli oğlu-44; oğlu: Səfərəli-5, Ağaəli-4
10. Allahyar Rəhim oğlu-47; oğlu: Əbdürrəhim – 16, Şahpələng-3
11. Seyid Eyyub oğlu – 26, oğlu İsa-4, qard. Məhərrəm-10
12. Məlik Tarverdi oğlu – 28
13. Mütəllim İbrahim oğlu-42; oğlu: Əlibəy-15, Vəlibəy-10, Alvabəy-8, Şeydabəy-6, Ağabəy-3
Hərbi nökərlər:
14. Nurməmməd Əbdül oğlu-37, oğlu: Bağır-5, Ədil-3, qard. Əziz – 34
15. Aşurbəy Ramazan oğlu-27, oğlu Çələbi-2; qard. Turab-35, Piri-29; Aşurbəyin qard. oğlu: Sərkər Tural oğlu-3, Səlim Piri oğlu-4
16. Şıxnəzər Şıxkərim oğlu-40 oğlanları Kərim-6, Seyid-3, Şıxnəzərin qard. Yusuf-26.

Cəmi 57 nəfər sünnüməzhəb kişi və oğlanın qeydə alındığı bu kəndin sakinləri oturaq həyat keçirirdi. Kəndxuda xəzinəyə ildə 3 rubl 50 qəp. , kəndlilərin hər ailəsi 1 rubl 50 qəp. ödəyirdi. Rəiyyətlərin hər bir təsərrüfatı həm də 1 ruba buğda və yarım ruba arpa ödəyirdi. Kənddə 300 ruba yararlı əkin sahəsi, 500 ruba yararsız sahə, 50 ruba biçənək vardı. 15 tut, 5 meyvə bağı, 1 dəyirman və 1 ding vardı.

Bu kənd çar Rusiyası tərəfindən Fətəli xan Əlmurad bəyin qardaşına vermişdi.
Mirzə Mirzə oğlu yoxsul və şikəst olduğuna görə vergi ödəmirdi. Rəncbərlər Mehrəli və Allahyar hər biri xəzinəyə ildə 4 rubl gümüş pul ödəyirdilər. Rus hökuməti onları ömürlük Əlmurad bəyə vermişdi. Seyidəli, Mütəllim və Məlik isə vergidən azad rəncbərlər kateqoriyasına daxil idilər. Seyid və Məlik Əlmurad bəyə, Mütəllim isə mahal naibi Yəhya bəyə verilmişdi. 3 hərbi nökər də xəzinəyə vergi verməkdən azad idilər.

